

# ƏQL- İMAN VƏ İNSANŞÜNASLIQ

haqqında suallar və cavablar
(Zəka, İnam və antropologiya)



MƏHƏMMƏD RIZA KAŞİFİ

Tərcüməçi:
ƏLƏDDİN MƏLİKOV

# Mündəricat

## ƏQL– İMAN VƏ İNSANŞÜNASLIQ

### KİTAB HAQQINDA

Kitabın adı: ƏQL– İMAN VƏ İNSANŞÜNASLIQ

MüəLLIF: Məhəmməd Riza Kaşifi

TəRCüMəçI: Ələddin Məlikov

Kamputerə yığan: Fərqanə Məlikova

Korrektor: Seyid Möhsen Emadi

Redaktor: E. Rəhimli

Naşir: Beynəlxalq əl–Mustafa(s) Nəşr və Tərcümə Mərkəzi

ISBN: ۹۷۸–۹۶۴–۱۹۵–۴۶۵–۱

ÇAPXANA: Tövhid, Qum

Çap tarixi: ۲۰۱۱

Çap növbəsi: Birinci

Tiraj: ۱۰۰۰



:SATış MəRKəZI

İran, Qum, Şühəda meydanı, Höccətiyyə prospekti, Beynəlxalq əl–Mustafa(s) Nəşr və Tərcümə Mərkəzi. Telfaks: +۹۸ ۲۵۱ ۷۷۳۰۵۱۷

İran, Qum, Məhəmməd Əmin (s) prospekti, Caməətül–ülumun kənarı, Beynəlxalq əl–Mustafa(s) Nəşr və Tərcümə Mərkəzinin satış şöbəsi

Tel/Faks: +۹۸۲۵۱ ۲۱۳۳۱۰۶ / +۹۸۲۵۱ ۲۱۳۳۱۴۶

ƏQL– İMAN VƏ İNSANŞÜNASLIQ

haqqında suallar və cavablar

(Zəka, İnam və antropologiya)

MƏHƏMMƏD RIZA KAŞİFİ

:Tərcüməçi

ƏLƏDDİN MƏLİKOV

səh:۳

**NAŞİRDƏN**

Hər hansı inkişaf mərhələsini keçən elmi – tədqiqi bir iş ilkin olaraq yazıçının ilham zəmisinə səpdiyi sorğu-suallarla başlayıb, müəyyən zamanda verdiyi səmərə ilə yekunlaşır. Əlbəttə, bu işin sonu yox, yeni-yeni fəaliyyətlər üçün ümid və təşəbbüs deməkdir. Belə ki, əldə olunan hər bir səmərəli qazancın məhsuldarlığı həmişə onun artımı üçün şərait yaradır. Demək, zaman keçdikcə elm, bilik, hünər əhli onun .toxumlarını becərib-yetişdirir, daim elm və mədəniyyətin cərəyanını təmin edir

Fasilə və hüdudları həddən artıq azaldan son müasir zamanımız coşqun tufan kimi, maraqlanan hər şəxsin qarşısına qalaq-qalaq məlumatı sovurub gətirir, mədəniyyətin yeni bir mərhələsinə qapı açır. Hər halda onun normal inkişafında, şübhəsiz, düzgün .təsəvvür və istiqamət həlledici rola malikdir

Beynəlxalq əl-Mustəfa (s) Universiteti ümumdünyəvi rolu, dini hövzələr arasında xüsusi yeri və yetdik kadr imkanına malik olduğunu nəzərə alaraq, artıq, elmi təhqiqat və tədqiqatlar üçün geniş şərait yaratmağı qarşısına qəti məqsəd qoymuşdur. Bununla əlaqədar Beynəlxalq əl-Mustəfa (s) Universitetinin tədqiqat şöbəsi fundamental proqramın təşkili, mövcud avadanlığın düzgün təmini və dini sahələrdə araşdırma aparmaq istəyənlərin cəlb olunmasını özünün ən mühüm vəzifələrindən

bilir. Ümid edirik ki, elmi-təhqiqi işlərə qarşı maraq və dirçəlişlərə zəmin yaratmaq və potensial imkanları inkişaf etdirməklə dünyanın hər bir guşəsində dini mədəniyyətin !çiçəklənməsinin şahidi olaq

(Beynəlxalq əl-Mustafa(s

Nəşr və Tərcümə Mərkəzi

səh:۶

## MÜNDƏRİCAT

səh:۷

## MÜTƏRCİMDƏN

Sual soruşmaq, bilmədiklərini öyrənmək insan yaradılandan onun təbiətində qoyulub. Belə bir aforizm var ki deyirlər: həm sual elmdən gəlir və həm cavab. Yəni elmi olmayan adam nə sual verə bilər və nə cavab.

Sual və cavab obrazlı formalar müqəddəs kitabımız olan Quranda da gəlibdir. Tanrı belə buyurur: "(Ya Rəsulum!) Səndən qadınlar barəsində fətva (əsasında hökm çıxarılan şəri hökm) istəyirlər".(١) Və ya "(Ya Rəsulum!) Səndən fətva istəyirlər".(٢) Ehtimal verilir bunun məqsədlərindən biri də müsəlmanlarda soruşmaq ruhunu oyatmaq və bilmədiklərini öyrənməyə sövq etdirməkdir. Bu minval sonralarda Peyğəmbərin (s) və imamların həyatında davamlı şəkildə öz əksini tapmışdır.

Bu arada insanın bilik və baxışına aid olan sual və cavabar toplusu spesifik yer tutur. Bu növ suallar cəmiyyətin və mədəniyyətin

zənginləşməsinə və inkişafına döğru aparan amillərdəndir.

Belə qərara gəlmişik ki, bu toplunu silsiləvi şəkildə əziz oxuculara təqdim edək.

Hazırda qarşınızda olan kitab bir neçə illər ərzində Həzrəti



---

١-[١]. Nisa surəsi, ayə ١٢٧

٢-[٢]. Nisa surəsi, ayə ١٧۶

Məhəmməd Rıza Kaşifinin dəftərxanasına gələn suallar toplusunun birinci cildidir. Bu .cavablar O həzrətin suallara verdiyi cavablardır

Burada bu işin ərsəyə gəlməsində əziyyət çəkən bütün şəxslərə təşəkkür etməyi və .minnətdarlığımı bildirməyi özümə vəzifə bilirəm

səh:۱۰

## ÖN SÖZ

Yer mərifət asimanıdır və insanlar behişt hissələridir. İnsanlar sual verməklə cənnət qapılarını açmaq olar. Mavi asimana baş ucaltmaq istəyən insanlar yalnız sual .soruşmaqla ürək sıxıntılarını aləmə açıqlıyırlar. Elm pillələrini bir-bir fəth edirlər

:Əli(ə) bu barədə buyurur

«القلوب اقفال، مفتاحهاالسؤال»

Ürəklər qıfılla kilidləniblər, sual vermək onun açarıdır”. Mərifət və bilik gövhərindən“ sual sormaq lazımdır. Qüllələri fəth edən biliklər sadiq sualların cavablarından :meydana gəlir. Məhz buna görə birinci imam buyurur

«من أحسن السؤال علم»؛ «من علم أحسن السؤال»؛

”.Filosoflar bu haqda deyiblər: “həm sual, həm cavab elm və bilikdən qalxır

Cəmiyyət və mədəniyyətin qalması və yeniliyi həqiqəttələb sualların və zəkalı .cavabların ortaya çıxmasındadır

səh:۱۱

## İSLAMDA ƏQLİN ƏHƏMİYYƏTİ .١

Sual

?İslam nəzərində “Əql” nədir? və idrak prosesində hansı rola malikdir

Cavab

Ayə və rəvayətlərdə (hansı ki, islamı tanımağın iki əsas və köklü mənbəyidirlər), açıq formada əql üçün tərif gəlməyib vəadətə uyğun onun mahiyyəti müəyyən formada təriflər bəhsində açıqlanmayıbdır. Amma müxtəlif deyiliş və cümlələrlə əql və əql sahibinin xüsusiyyətlərinə işarə olub ki, bunun vasitəsilə müəyyən qədər əqlin şüalarının bəzisinəəl qapmaq olar. Ona görə də Quran və hədislərdən istifadə :etməklə, bu yerdə bu şüaların bəzisinə aşağıda açıqlamağa çalışacağıq

Əqlin əsl mənası, bağlamaq və saxlamaqdır. Ona görə də. O idrak ki, insan ona – (١ qəlbini bağlayır və onunla bir şeyi anlayır, əql adlanır. Həmçinin, onun vasitəsilə xeyr və şərri və haqq və batili bir- birindən ayıran qüvvəyə əql deyilir. Onun əks mənası, dəlilik, axmaqlıq və cəhldir. Quran nəzərindən, əql ilahi bir lütfdür ki, insanı haqqa doğru hidayət edir və yolunu azmaqdan xilas edir. Əllamə Təbatəbayi buyurur: "Qurani şərif əqli elə bir qüvvə bilir ki, insan dini işlərdə ondan faydalanır və onu həqiqi elmlərə və bəyənilən əməllərə rəhbərlik edir. Bu yoldan çıxdıqda, daha əql adlanmır. ,Quranı şərifdə əqldən məqsəd. O idrakdır ki

(fitrət sağlam olanda, insan üçün tam formada hasil olur."(١)

Qurani kərimdə əql maddəsindən ۴۹ dəfə istifadə olunubdur. Eyni halda, digər . ۲ kəlmələr də əqllə həm- məna gətiriliblər. Məsələn helm. (Tur, ۳۲. nuha (Taha, ۵۴ – ۱۲۸). Hicr (Fəcr, ۵). Qəlb (Qaf, ۳۷, Həcc, ۴۶. Tövbə ۸۷- ۱۲۷), lobb (Ali imran. ۷. Rəd, ۱۹, Zümər, (۱۸, Qafir, ۵۴

Rəvayətlərdə də əql həqiqətləri tanımaq üçün bir vasitə bilinibdir. İmam Sadiq (ə), .۳ uzun və maraqlı bir rəvayətdən olan bir hissədə buyurur: “Allah insanları onunla bəzəyib və onlar üçün işıq verən qərar verdiyi şey, əqldir.” Deməli bəndələr əqlin .vasitəsilə, öz yaradlarını tanıyıb və yaxşını pisdən seçiblər

Qaranlığın nadanlıqda və işıqlığın bilikdə olduğunu biliblər. Bu, əqlin onları ona doğru (hidayət etdiyi bir şeydir.”(٢)

Əqlin yaranması barəsində olan rəvayətlərin hamısından belə istifadə olur ki. əqlin .۴ iki qalxma və enmə qövsü var. Ona iqbal (üz tutmaq, bəxt) və idbal (qayıtmaq) deyilmişdir.(٣) İslamın böyük alimlərinin təfsir və hədislərinin məzmununa diqqət etməklə, əqlin iqbalı, təbiət aləminə, cisi. Maddə və çoxluluq aləminə olan iqbalıdır. Bu aləmdə əql özünün ən aşağı dərəcəsində qərarlaşır. Camaat onu bəzən yaşayış və bəzən də məad işlərində, işlədirlər. Aşağı dərəcəyə enmiş əql, o əqldir ki. bəzən müxtəlif elimləri öyrənmək və təcrübələr əldə edib və onları qorumaq üçün istifadə .olunur

«العقل حفظ التجارب»(۴)

Amma əqlin idbarı, yəni bu dünyaya arxa çevirib və onun əsl yeri olan tövhidi və ilahi (əqlə doğru qayıtmaq.(۵)

Bu tərəfdə olan əqlə, iktisabi əql. Cüzi əql, bəsəri əql, dünyəvi əql deyilir. O biri tərəfə .diqqət edən əqlə, axirət əqli, ilahi əql, kulli əql və Allah verən əql də deyilir



---

Əl- mizan, cild ۲, səh ۲۵۰ . [۱] -۱

Üsuli kafi, cild ۱, kitabul- əql vəl- cəhl, rəvayət ۳۵ . [۲] -۲

M. E. Üsuli- kafi, cild ۱, səh ۱۰- ۲۱ . [۳] -۳

Əbdül- vahid Amədi, Qürərül- hikəm, və Qürərül- hikəmin şərhi, şərhçi və . [۴] -۴
tərcüməçi Cəmaləddin Məhəmməd Xansari, cild ۱, səh ۱۷۷

M. İ. Məhəmməd ibn İbrahim, Sədrəddin Şirazi, üsuli- kafinin şərhi, təshih, . [۵] -۵
Məhəmməd Xacəvi, cild ۱, səh ۴۰۳

"Kulli əqlə dedi "ma zağəl bəsər

.Cüzi əql hər tərəfə baxır

,Ma zağə"əql seçilmişlərin nurudur"

(zağə"əql ölülərin kor ustadıdır.(١)"

Ayə və rəvayətlərin deyilişi, bu həqiqəti açıqlayır ki, islam nəzərindən cüzi əql öz .۵ mənşəyinə qayıtmalıdır. Yəni kulli əqllə birləşməli və bəşəri əql ilahi əqlin rənginə girsin və dünyəvi əql, axirət əqli olsun. İktisabi əql, Allah verən əqlin xidmətində olmalıdır. "Kulli əql" o əqldir ki, məqsədə yetişməyə səbəb olur. İlahi əql o əqldir ki, özünü ilahi əmrə tabe edib və onun qarşısında səhv etməyi doğru saymır. Ona görə də, cüzi və aşağı olan əql, öz mənbəyi ilə əlaqə yaradıb, özünün yuxarı olan seyrini əsl vətəninə başlaması və bu seyr, bağlılıq və diqqətin sayəsində, insanın yol göstərəni olması üçün, islamda düşünmək və pərhizkarlıq bir- biri ilə yanaşı açıqlanıbdır.(٢) Bu barədə Əllamə Təbatəainin sözü oxunmalıdır: "Quranı məcidin və rəvayətlərin, elmin kənarında təqvanın olmasını şərt bilmələrində heç bir şəkk yoxdur. Amma bu onun üçün deyil ki, məntiqi təfəkkürün qarşısında (hansı ki, fitridir və insan ondan istifadə etməlidir) müstəqil və ayrı bir yol olaraq təqva və ya təfəkkürlə yanaşı olan təqva qərar verilsin. Şübhəsiz, insan yalnız şüur qüvvəsinin tələb etdiklərini yaratmaqla, öz fikirlərinə qalib və öz biliklərini genişləndirə bilər. İnsanın öz qüvvələrindən birində ifrat və təfrit etməsi, onun fikir və biliklərində azmaların olmasına səbəb olur. çünki, ifrat nəticəsində, o qüvvənin bütün istəklərini əməldə edir və onu digər qüvvələrin fikir və təsdiqlərindən qabağa salır və digər qüvvələrin istəklərindən xəbərsiz qalır. Buna əsasən, faydalı elm və haqq mariflər, yalnız o vaxt ələ gəlir ki, bəşər öz əxlaqını düzəltsin və özünü layiqli və insanı fəzilətlərini tamamlasın ki, bu həmin təqvadır. Qurani kərim, fikrin möhkəmliyi, ülmin doğru yolda olması və onun şeytani ,vəsvəsələrdən və heyvani fikirlərdən uzaq olmasına görə



---

Məsnəvi, ۴, ١٣٠٩- ١٣١٠ . [١] -١

Nümunə üçün baxın: Ğafir surəsi, ayə ٣ . [٢] -٢

təqvanı təfəkkür və düşüncədə şərt bilibdir. Nəinki məntiqi təfəkkürün qarşısında, (təqvanı da (yada salmaq kimi) müstəqil və ayrı bir yol qərar versin.(١)

.Yenə Əqldən heyvanlara nəql etdi

.Kamil əqli zəka ilə yanaşı et

(Ta ki, o pis batindən yenə ağıl ələ gəlsin.(٢)

٦. İslam əqli höccət bilibdir. Ayə və rəvayətlərin çoxu, müxtəlif formalarda, elmi məsələlərdə əqlin höccət olmasını təsdiqləyib və yaranış sistemi haqqında düşünmək və təfəkkürə həvəsləndirmişdir. Başqa sözlə, Qurani məcidin təfəkkür və düşünməyə çoxlu dəvət etməsi, əgər əql və əqli dəlillərin nəticəsi höccət olmasa, mənasız və bihudə olacaq. Digər tərəfdən, Allahın çox yerdə kafir və müşriklərdən dəlil gətirmələrini istəməsi, ağıl qüvvəsinin vasitəsilə baş verən məntiqi dəlil, höccətdir. Hər (iki düşmən tərəf, öz iddialarını isbat etmək üçün, ona istinad edirlər.(٣)

٧. Quran və rəvayətlər, ağıldan istifadə etməyin yolunu açıqca deməyib və müəyyən etməmişdir. Əksinə müxtəlif cümlələrlə camaatın öz daxillərində olan idrak və fitri ağıllarına əsasən anladıqları şeyə həvalə edibdir. İndi bu sual ortaya çıxır ki, bəşərin fitrətinə əsasən tanıdığımız yol, nədir? Əllamə Təbatəbai bu suala belə cavab verir: "Biz hər şeydə şəkk etsək də, bunda şəkkimiz yoxdur ki, bizim rəftarımızdan ayrı və müstəqil, həqiqi xarici bir sıra varlıqlar var. Məsələn, məbdə və məad məsələləri və ya təbii və riyazi məsələlər, biz əgər onlara yəqini formada əl tapmaq istəyəndə, şəkkə yer olmayan bir sıra bədihi və əvvəli aksiomları seçirik və birinci dəstənin lazım tutduğu digər aksiom silisiləsini ona əlavə edirik. Xüsusi bir fikir sıralaması ilə onları tənzimləyirik. Sonda öz istədiyimizə əl tapırıq. Bu əvvəli maddə və formalar, bədihi işlərdir. Belə ki, sağlam fitrət onlarda şəkkə düçar olmur. Yalnız o zaman bunun



---

١- [١]. Əl- mizan, cild ٥, səh ٢٦٧- ٢٧٠.

٢- [٢]. Məsnəvi, ١/٣٢٢٠ və ٥. ٧٣٨.

٣- [٣]. Bu barədə Ənfal surəsi, ayə ٢٢, Yunus surəsi, ayə ١٠٠, Bəqərə surəsi, ayə ١١١, .

əksi olur ki, sağlam düşüncə və əqldən faydalanmasın. Nəticədə bbu zəruri şeyləri düzgün təsəvvür etməyibdir və ona görə də bədihi təsəvvür və təsdiqlərin yerinə, .digər bir təsəvvür və təsdiqi məfhumları seçirlər

Qurani kərim, ağılları, onun fitrətində yeri olan və öz təbiətinə uyğun olaraq tanıdığı və ülfəti olduğu şeyə, dəvət edir. O, məlum şeyləri məhculları kəşf etmək üçün tərtibləməkdir. Ağılların fitrəti olan şey budur ki, həqiqi məlumatlar ələ gətirmək üçün, yəqini və həqiqi müqəddimələr hazırlamalıdır ki, məntiqi dəlil, bundan başqa bir şey deyil və əmələ aid olan şey üçündür. Məsələn xoşbəxtlik, bədbəxtlik, xeyir, şər. fayda və zərər və o şeylər ki, yerinə yetirməli və o şeylər ki, tərk edilməlidir ki, bu etibari işlərdir, məşhur ya qəti müqəddimələri hazırlayır ki, məntiqi cədəl adlanır. Yəqini olmayan və yalnız onların yaxşılıq və pisliyinə güman edilən ehtimalı xeyir və şər yerlərində, güman edilən bir xeyir və şərrə irşad üçün, gümani müqəddimələr işlənir. (Bu məntiqdə xitabə adlanan möizə və öyüddür.(١

İslam mütəfəkkirləri, bu məsələyə əsasən, islam məntiqini yazıblar ki, düşünməyin (metod və üslubunu və ağıldan necə istifadə etməyi açıqlayır.(٢

?"Amma, sualın ikinci hissəsinin cavabı, yəni "həqiqətləri tanımaqda ağıl şərtinin həddi

Qurani məcid və məsumların rəvayətləri, bir sıra üstün həqiqət və maarifi tanımaqda ağılı gücsüz bilib, onu nəinki yalnız bəşərin əbədi xoşbəxliyi üçün kafi bilmir, hətta insanın dünya həyatını tənzimləmək üçün ehtiyac olduğu bütün elimləri dərk və anlamamasını bilir. Quran ayələrinin bəzisi, bunu göstərir ki, ilahi elçilər elə bir şeyi camaat üçün gətirirlər ki, bəşər ağılı onu heç vaxt dərk və anlaya bilməz.(٣) Digər bir sıra ayələr bunu göstərir ki, elçilərin göndərilməsi. Höccəti tamamlamaqdır. Bu özü ağılın bəzi varlıq həqiqətlərini



---

Əl- mizan, cild ٥, səh ٢٥٥- ٢٥۶- ٢۶٧ . [١] -١

İslam məntiqi ilə tanışlıq üçün, baxın: Məntiqin şərhi, Məhəmməd Müzəffər, Əli . [٢] -٢ Şirvaninin tərcümə və şərhi

:Bəqərə surəsi, ayə ١٥, Ənam surəsi, ayə ٩١, surələri . [٣] -٣

anlamaqda, kafi deyil, çünki, əgər ağıl kafi olsaydı, höccət onunla tamamlanmalı idi və elçilərin göndərilməsi bihudə olmalıydı ya ən azı yalnız ağılın hökmünə təkid üçün olmalıydı.(١) Həmçinin ayələrin bir dəstəsi, bu məsələni yada salır ki, insanın təbiəti ixtilafa meyillidir. İxtilafı aradan qaldırmaq, ağılın öhdəsindən xaricdir, bu iş yalnış peyğəmbərlərin göndərilməsi ilə mümkündür.(٢)

Zirəklik satıb, heyranlıq al,

Zirəklik gümandır, heyranlıq nəzər,

Mustəfa önündə ağılı qurban et,

"Həsbiyəllah" de ki, Allah edəsən məni.(٣)

Rəvayətlərdə işarə olunmuş ağılın digər məhdudiyyətlərindən biri, Allahın zatının mahiyyətini tanımaqda ağılın gücsüzlüyüdür. Başqa sözlə, rəvayətlərdə əmr verilib ki, Allahın zatı barəsində fikirləşməkdən çəkilsin. Fikir və ağılın onun qeybi zatına yolu yoxdur. Heyrançılıq və yolunu azmaqdan başqa bir şey, ona nəsib olmayacaq.(۴)

Nemətlərdə fikirləşmək yolun şərtidir,

Amma Allahın zatında, yalnız günahdır.

Allahın zatında düşünmək batildir,

Hasili əldə etməyi, qəti qeyri mümkün bil.(۵)

Deyilənlərə əsasən, müsəlman şiə alimlərinin hamısı, ağılı bəzi bilikləri tanımaqda meyar, bəzi həqiqətləri tanımaqda cıraq və vəziyyətlərdə isə, açar bilirlər.

A)- Bəzi məsələ və nəzəri hökümlər və əqli məbdələr barəsində, ağılın ölçü və meyar olması ona bağlıdır. Məsələn Allahın, peyğəmbərliyinin və onun fəri məsələlərinin isbatı. Əlbəttə ağıl vəhy barəsində haqq sözünə əsasən bu çərçivədə deyil.

Əksinə onu təkmilləşdirən və insanı həqiqətlərə hidayət edən dəlillərdən biri dərəcəsinə açıqlanmışdır. Yeddinci imam (ə) Hişama buyurur: "Allahın insanlara iki

höcəti var: Biri daxili

səh:۲۰

---

Surələr, Nisa surəsi, ayə ۱۶۵ Taha surəsi, ayə ۱۳۴ . [۱] -۱

Bəqərə surəsi, ayə ۲۱۳, bu barədə baxın: Mürtəza Rəhimi nejad, Hikmətü şiə, . [۲] -۲
Səh ۶۳- ۷۰

Məsnəvi, ۴, ۱۴۰۷- ۱۴۰۸ . [۳] -۳

Baxın: Nəhcül- bəlağə, xütbə ۱, ۴۹- ۹۱ . [۴] -۴

.Gülşəne raz . [۵] -۵

(höccət ki, əqlidir. O birisi isə xarici höccət ki, vəhydir".(١)

B)- Şəriətin daxili gətirdikləri və həqiqətlərinə nisbət ağılın çıraq və işıq olmasıdır. Həqiqətdə, bu çıraqdan istifadə etməklə, şəriətin hökümləri müəyyənləşir və seçilir. :Amma ağılın şəriətin hökümlərini almaq həddində iki cürdür

Birinci: Quran, peyğəmbər və imamların rəvayətlərini açıqlamaq üçün çalışmaqdır. Bu çalışmaq, şəri hökümləri anlamaq üçün olan əqli dəlillərdir. Başqa sözlə, biz ayə və rəvayətlərdə olan məsələləri anlamaqda, öz ağıl və düşüncə qüdrətindən istifadə .edirik

İkinci: Şəri hökümləri əldə etmək üçün, əqli vasitələr və mənbələr vermək. Yəni, ağıl bəzən bir şey tapmaq üçün olan dəlillərdə, Quran və sünnədən götürülmüş təəbbüdi məbdələrdən istifadə edir, bəzən də məbdələrin bəzisini ya hamısını özü təmin edir. Məsələn, "hüsni qubhi əqli" (ağılın yaxşı və pisi seçə bilməsi) ya "bir şeyin vacib olmasından onun müqəddiməsinin də vacib olmasını kəşf etmək" məsələsi, bunların hamısı, dini mövzuların isbatında, əqli məbdələrin olmasının yerlərindəndir. (Aydındır .(ki, bu qısa sürətdə, nümunə gətirməklə bu yerlərin geniş şərhinə başlamaq olmaz

C)- Ağılın açar olması, bu mənadadır ki,eləki ağıl "çıraq"formasında öz vəzifəsini qanun və qaydaları tanımaqda yerinə yetirdi və şəriət hökümlərini öz varlıq üfüqündə ümumi, mücərrəd və sabit məfhumlar formasında aşkarlayandan sonra, şəriətin təsir sahəsinə girmək və dəxalət etmək haqqı yoxdur. Məsələn, ilahi hökümləri tanıyandan sonra, ağıl o hökümlərin sirləri barəsində araşdırma etməyə qadir deyil, çünki o, hökümlərin sirri, qeyb aləminə aid olub, qeyb aləmi barəsində yalnız ümumi şeylər (bilən ağılın dəlil gətirməyə əl tapa bilməsindən xaricdir.(٢)

Bu sualın cavabının sonunda, Əllamə Təbatəbainin sözlərinin bir hissəsi Ənam surəsinin ٩١- ci ayəsinin şərhində



---

Üsuli kafi, Əql və Cəhl bölməsi, cild ١, səh ١۶ . [١] -١

Bu barədə baxın: Əllamə Abdullah Cavadi Amili, Şəriət mərifət güzgüsündə, səh . [٢] -٢

qərar verib və onun barəsində onu öyrənməyə qüdrətinizin olmadığı buyurduğu əməldən məqsəd, Allahın ona yetişmək üçün insana ağıl, hiss və xəyal kimi vasitələrini verdiyi adi elm deyil, çünki, iddia bu idi ki, Allahın ilahiliyinin lazım tutduğu budur ki, insanı öz xoşbəxtliyinə doğru hidayət etsin və insanların bəzisinə vəhy və kitab göndərsin. Bu iddianın hər şəraiti olan və ona yetişə bilən həyatın xeyir və şərrinə adi .elmə heç bir aidiyyəti yoxdur

Təlimdən məqsəd, o şeydir ki, insan– öz- özlüyündə ixtiyarında olan vasitələrlə ona elm tapa bilməz, bu o həqiqətlərdir ki, Allah öz peyğəmbərlərinə və vəhy daşıyanlarına .verir. İstər kitab yolu ilə olsun, istərsə də ondan qeyrisi ilə

İlahi maarif, əxlaq və cəmiyyət sistemini qoruyan qanun və qaydalar, əldə oluna bilən elimlər deyillər. Ümumi maarif, tövhid, nübüvvət, məad və əxlaqi qanunların bəzisi kimi, ağılın çalışması ilə əldə olunanlar, bəşər cəmiyyətini insani xoşbəxtliyinə yetirmir. Maddi ləzzətlərdən faydalanmaq və nəfsin ən üstün ləzzətlərinə yetişmək üçün hər bir vasitədənistifadə etmək, bəşər fürsət vermir ki, onun fitrətində olan maarif .xəzinələrində diqqətlənsin və öz həyatını o maarifə əsasən qursun

Bəşər cəmiyyətinə hakim olan maddi şüur və ictimai ağıl, heç vaxt insanı bu ilahi .maarifə və mənəvi fəzilətlərə yetirmirlər

ullimtum ma ləm tələmu" cümləsi yalnız tövrat qanunları və" «علّمتم ما لم تعلموا» Deməli maarifi barəsində deyil. Əksinə vəhy və kitab yolu ilə bəşər içində yayılmış bütün şəriət (və maarifə aiddir".(١



---

Əl- mizan, cild ٧, səh ٢٧٥ . [١] -١

## ƏQL VƏ QƏLB.۲

Sual

Həqiqətləri anlamaqda Əql və qəlbin rolu nə dərəcədədir? və hər şeyə əql hökm edirsə, şəriətdə ona hökm edir, qaydası şəriətlə mistikanın müxalifətini nədərəcədə ?açıqlayır

Cavab

Dünyanın təbiət və maddi varlığına yox həqiqətini dərk etmək üçün ki, təcrübə və .hissiyyatla maddi dünya tanınır iki yol var

Birincisi Ağıl, fikir və düşüncə. İkincisi isə kəşf və müşahidədən ibarətdir. Fikir və düşüncə yolu bir yoldur ki, düşüncə ilə başlanıb dəlil gətirərək insanın ağılında düşüncə yoluyla həqiqəti tapır. Kəşf və müşahidə yolu isə öz əməlləriylə başlayır və qəlbin təmizlənməsiylə insanın qəlbi həqiqətləri görüb dərk edir. Əlbəttə ki, bu cür görmək gözlə görməkdən fərqlidir. Ariflər insan fitrətində olan eşqi, imanı və əqidəni çalışılırki, gücləndirsinlər və bununla Allahı qəlbdə dərk edən hissiyyatı gücləndirməyə çalışırlar və ona mane olan hər bir şeyi məhv edirlər. Filosoflar ağılın gücünə çox diqqət yetirirlər və insanlar ki, burhan və dəlillərlə, çətinlikləri keçərək və ağıla səbəb olan .maneələr və bəlalardan uzaqlaşmaqla, dünyadakı həqiqətlərə yol tapmaq olar

Demək olar ağıl və qəlb, dünyanın həqiqətlərini tanımağa

.iki ayrı yoldur ki, onların hər birinin öz xüsusi metod və qaydası vardır

?Amma buna diqqət etmək lazımdır ki, görəsən hər ikisi bu yolda bir mövqedədirmi

Əvvəl belə başa düşülür ki, ağıl, qəlbin qarşısında və şühud isə düşüncənin qarşısındadı, həqiqətdə də bu belədir amma qəlbin qarşılığında olan ağıl, o ağıldır ki, təbiət, varlıq və bütün yaradılışların qarşısında ona cüzi, insan və maddi (dünyəvi) ağıl deyildir, bu ağıl, odur ki, özünü ilahi, axirət və tam ağıldan ayırmamışdır və bunun üçündə özünü nəfsin, özü düzəltdiyi dəlillərin və əsası olmayan düşüncələrin ixtiyarında qoymuşdur; və yalnız özünü bunlara cavab verib mane olmaq da məsuliyyət sahibi bilir. Bəli, belə bir ağıl ariflərin nəzərində varlığın həqiqi şuhuduna .mane olur və bunun üçün də bundan qəti sürətdə qadağan olunur

(Ağıl kar bir insan kimidir ki, pərdəsi cahillikdən ibarətdir.(۱

Amma əgər ağıl özünü bu məcazi həbsdən qurtarsa və təqvaya riayət etsə və özünü (əsl mənbəyinə yəni ilahi və tam ağıla bağlasa, o ağıl qəlbin qarşısında olmayacaq.(۲

Qəlb və şuhud belə bir ağılın köməyi ilə nəticəsində inkişaf edib hidayət olur və gələcək əqidələrin ağıldan öyrənib onun köməyi ilə həqiqi şuhudu şeytanın vəsvəsə və hiyləsindən ayırır. Beləliklə qəlb öz müşahidələrini (gördüklərini) açıqlamaqda ağıldan bəhrələnir.(۳) Bu həqiqi dəlil ağılı, həqiqi olan irfanı kəşf etməyə və onun həqiqətlərini öyrənməyə malikdir. Arifin kəşf etdiyi hər bir şey dəlil istəyir, başqa sözlə desək, ağıl həqiqəti tanımaq üçün bir ölçüdür; çünki arif öz şühudundan sonra xəbər verdiyi hər bir şey ağıl və dərrakədən ibarətdir və bu düşüncənin doğru və həqiqətini açıqlamaq üçün, buna münasib olan bir ölçü cihazından (vasitəsindən) istifadə



---

Məsnəvi, ۶, ۴۱۳۸ . [۱] -۱

Babe əqli cüzi və kulli, Əl- mizan, cild ۵, səh ۲۶۷- ۲۷۰ və Məhəmməd ibni İbrahim, . [۲] -۲ Sədruddin Şirazi, Şərhe Usulu kafi, cild ۱, səh ۴۰۳- dən sonra

Babe niyazməndi kəşf və şuhud be təəqqol Məhəmməd Təqi Misbah Yəzdi, . [۳] -۳ amuzeşe fəlsəfə, cild əvvəl, dərse ۱۳

.etmək lazımdır ki, arifin gördükləri və dərk etdikləri, vəsvəsə və xəyal deyildir

Rəvayətlərdə deyildir arif o kəsdir ki, onun rəftarı, ağılı, qəlbi və düşüncəsi iki qanad kimidir ki, bir- birini tamamlayır, bütün bu rəvayətlərdən yalnız Əmirəl mominin Əli (ə)-dan olan bir rəvayətlə kifayətlənirik və özümüzü və siz əzizləri buna diqqət yetirməyə :tövsiyə edirik

«(العارف) قد أحيا عقله و أمات نفسه حتّى دقّ جليله و لطف غليظه و برق له لامع كثيرالبرق فأبان له الطّريق و سلك به السّبيل»

Həqiqətən (arif) öz ağılını yaşadır və nəfsini isə öldürür, bədənini arığladır, əxlaqını" zərifləşdirir. Onun üçün parlaq nur parıldayır, onun nuru üçün yol açır və nur ilə öz (yoluna davam edir.(١)

Amma "O şeylər ki, ağıl ona hököm verir, şəriətdə ona hököm verir"(٢) bu qanun bunu açıqlayır ki, ağıl tərəfindən sabit olan hər bir şey şəriət- Allah Taala tərəfindən də təsdiqlənir, başqa sözlə, bu qanun belə bir həqiqəti açıqlayır; ağıl buna qadirdir ki, Quran və sünnətin yanında dini tanımaqlıqda kömək etsin, o cür ki, əvvəldə qeyd oldu bu ağıldan məqsəd o ağıldır ki, axirətə, Allaha və tam olan aöıla üz çevirib və təqva ilə .birdir və bu təfəkkür və düşüncə bütün bəlalardan uzaqdır

Bu bir ağıldır ki, dəlil və isbat və yəqini özüylə töhfə gətirmişdir və bu ağıl heç vaxt kəşf və şuhudun batil olmasın və qəlbin işə yararsız olmasına yol verməz. Bunun üçündə deyə bilərik, ağıl qəlbi səhv yola yönəldir və şəriətdə irfanı caiz bilmir (qəbul etmir) həqiqi dəlil ağılı (fikri) qəlbi səhvə doğru yönəltməyib irfanın həqiqəti kəşf etməsində .kömək edir və heç bir müxalifəti yoxdur



---

١- [١] . Nəhcül- bəlağə, xütbə ٢٢٠, dər in bab, neqareşe Əbdül Rəzzaq Lahici, Gövəre murad, səh ١٥- ١٧ və Əbu Əli Hüseyn ibni Sina, Əl- işarat və Əl- tənbihat, cild ٣, səh ٣۶٩

٢- [٢] . «كلّ ما حكم به العقل حكم به الشرع»

## ƏQL VƏ DUYĞU.٣

Sual

Emosiya ilə əqlin nə kimi əlaqəsi var? Aya onlar bir-birindən tam şəkildə ayrıdır? Əgər əlaqəsi varsa, onların əlaqəsinin keyfiyyəti necədir? Aya bütün insanlarda eynidir? Ümumiyyətlə emosiyaya varmaqın sağlam, düzgün və ortaq həddi nə qədərdir? Onları ?formulə edən qayda qanunlar hansılardır

Cavab

Bildiyimiz kimi emosiya digər insanla əlaqədə meydana gələn meyl və istəklərdir. Valideynin övladına olan məhəbbəti kimi. İnsanların digər insanlara olan rəngarəng məhəbbətlərindən ibarətdir. Amma hissə qapılma, duyğu və emosayanın şiddətli .halətlərindəndir ki, təkcə insana xassdır. Eşq, təəccüb, stayiş və sair hisslər kimi

Əql isə haqqı batildən, xeyri şərdən ayıran və dərkedici bir qüvvədir ki, bəşər onun vasitəsilə həqiqəti tanıma qüdrətinə malik olur. Emosiya, hiss və əqlin tərifindən aydın olur ki, onlar bir şey deyillər. Eyni halda bu üçü birbirilə sıx əlaqədədirlər. Bir sıra hisslər şiddətlənmiş emosiyalardır. Yəni duyğulu bir iş zamanında– Atanın övladına olan mehriban duyğusu kimi – şiddətlənir, ona hissə qapılma deyilir. Amma əqlin hiss və emosiya ilə təkcə əlaqəsi bundan ibarətdir ki, bu qüvvə öz öhdəliyində olan vəzifəyə əsaslanaraq insanın emosiya, hiss və

duyğularını kontrol etsin. Onların bir-birilə təzaddı təqdirində üstün olan hiss, duyğu və emosiyanı seçsin. Daha əhəmiyyətli budur ki, hiss və emosiyanın düzgün hərəkət .yolunu zəka müəyyənləşdirir

Emosiyaya varmaqın sağlam, düzgün və ortaq həddi insanın əql, zəka və elmi vasitəsilə hidayət olunmalıdır, tainki bəşər həyatının məqsədinin düzgün yolunda - ki, həmin kamaldır- qərar tutsun. Əgər hansısa bir hiss əqlə tabe olmarsa və bəşəri onun həqiqi və əsli kamalından uzaqlaşdırarsa düzgün hiss və emosiya hesab edilmir. Əlbəttə əqldən məqsədimiz bəşərdə olan məişət tədbirli cüzii əql deyil, əksinə həmin dünyada axirətə bağlı olan və cüziiliyində külliliyə əsaslanan bəşər əqlidir ki, İlahi əqlə birləşərək(١) öz məhdudluğuna baxmayaraq həqiqətləri dərk etməkdə çalışır. Dərk .etmə prosesində anlamadığı məsələləridə vəhydən kömək alır



---

.Dünyəvi vəTövhidi əqldən məqsədimiz birinci sualin cavabında keşdi . [١] -١

## DİGƏR DÜNYANI TANIMAĞIN KEYFİYYƏTİ.۴

Sual

Kainat daha bəşərin şüuruna sığışmır? İnsan zamandan necə xaric ola bilər? ?Ümumiyyətlə bəşərin bu qabliyyəti kəsb etmək imkanı varmı

Cavab

O biri dünya bizim idrakımıza sığır. İzah budur ki, əgər idrakdan məqsəd, nəzəri məsələlər, təsəvvürlər və məfhumlardan əqli idrak olsa ki, belə bir iş, mərifət sünaslıq bəhslərində isbat olubdur və burda onun barəsində bəhs etmirik, mümkün bir işdir. Yəni insan digər dünyaya və təbiət və maddə aləminin o biri tərəfinə nisbət olan nəzəri sistem və məfhumları dərk edə bilər. Amma əgər idrakdan nəqsəd, qəlbi və müşahidə idrakı olarsa, bu idrak digər bir dünyadan da mümkündür. Çünki qaydalara əsasən, onda açıqlanan idrak və əməli üslubun növüdür, insan elə bir mərhələyə yetişə bilər ki, (digər dünyanın müşahidəsini dərk edə bilər.(۱)

Amma, bu barədə ki, insan digər bir dünyanı dərk etməyi bacara bilər ya yox? Əgər məqsəd müşahidə idrakı olsa ki, güman edirik həmin məna sizin məqsədinizdir, onda bəli. Amma dünya sistemlərinin hər birinin özümə uyğun qanun və hökümlərinin



---

Baxın: Ayətullah Abdullah Cavadi Amuli, Quranda mərifət şünaslıq, səkkiz, . [۱] -۱ .doqquz, on iki, on üç və on dördüncü fəsillər

olmasına görə, insan elə bir dərəcəyə yetişməlidir ki, o sistem və qanunları qəbul etmək uyğunluğunu tapsın. İzahı budur ki, varlıq sistemində, müxtəlif səbəb var ki, hər birinin özünə məxsus hökümləri var. Bu hökümlər aləmlərin fərqlənməsinə görə, bir-biri ilə fərqlənirlər. Məsələn nasut ya təbiər aləminin özünə məxsus hökümləri var. Bərzəx alminin özünə məxsus hökümləri, qiyamət aləminin özünə məxsus əsərləri var. İnsan o aləmlərə girib və onları dərk etmək üçün, elə formada dəyişilməlidir ki, belə bir qabiliyyəti tapa bilsin. Ona görə də, insan ölümlə, bərzəx aləminə daxil olmaq üçün, elə bir dəyişiklik tapır. Yenə Quran ayələrinə əsasən, qiyamət aləminin əsər və hökümlərini qəbul və dərk etmyə hazırlıq üçün, bərzəx aləmində əsaslı dəyişiklik tapmalıdır. Buna əsasən demək olar ki, insanın qeyri maddi bir dünyanı dərk etməyə qabiliyyəti var, amma bu şərtlə ki, dəyişiklik nəticəsində bu qabiliyyəti əldə etsin, necə ki, insanların bəzisi bir sıra əməl, qayda yerinə yetirmək və seyr- suluk vədəsinə qədəm qoymaqla, yuxar aləmləri dərk və anlamaq qabiliyyətini, elə bü dünyada və ölüm və qiyamətdən qabaq kəşf edir və həqiqətlərin çoxu onlara məlum olur.(١) O cavan arif kimi ki, elə bu dünyada əməli irfan nəticəsində, o biri aləmin həqiqətlərini .müşahidə edirdi

,Cəhənnəm və behişt və bərzəx ortada

,Kafirlərin gözü önundə aşkar əlamət

,Kövsər hovzunu çeşməyə bənzədirəm

Ki, su onların üstünə vurur,səsi isə qulaqlarına

,Susayanı kövsər bilir

.Bir- bir adlarını deyim ki, kimdirlər

,Çiyinlərini mənim çiyinlərimə doxundurur

.Nərələri mənim qulağıma yetişir

,Cənnət əhli mənim gözüm önündə ixtiyardan

.Bir- birlərini bir kənara çəkmişdir

,Bir- birlərinin əlini ziyarət edirlər

(Və dodaqdan da öpüş qarət edirlər.(۲

Hər halda, əgər bir şəxs öz qəlbini paklayıb, daxili



---

.Bu barədə baxın: Ustad Məhəmməd Şücai, varlığa qayıdış, ruhun ucalması . [۱] -۱

Məsnəvi, ۱, ۳۵۳۵- ۳۵۴۰ . [۲] -۲

sərmayəsinə yol tapıb və ürəyinin gözü və qulağı ilə aləmə nəzər sala bilsə, birinci mərhələdə, təbiəti mələkutun ayna və əlaməti tapar və əşyalar mələkutda müşahidə etməklə, onların hamısının Allaha təsbih etdiyini görər. Digər dəfə yüksək mərhələdə, .mələkutu da bir güzgü görər ki, yalnız Allahın zikrini göstərər

Amma insan necə zaman çərçivəsində xaric olur? Keçən mərhələdən aydın olur ki, :insanın iki şən və cəhəti var

Biri insanın tanış cəhətidir. O birisi isə insanın özgə cəhətidir. Digər sözlə, insan bir :doğru və bir yalandan yığılmış bir qarışıqdır

,O yalanın bu fani bədənin idi

(Doğrun o rəbbani canın idi.(١

İnsanın tanış cəhəti, onun cismidir. Onun yad və doğru cəhəti isə, onun ruhudur. Bunların hər ikisinin özünə məxsus hökümləri var. Cismin öz hökmləri var və ruhun da öz hökümləri var. Ruhun çox mühüm hökümlərindən biri, hansı ki, digər aləmləri dərk .etməyə qabiliyyət tapır, ruhun mücərrəd olmasıdır. Yəni, ruh maddiyyatdan yuxarıdır

Ruh maddi bir şey deyil. Ona görə də məkanı olmaq və zamanı olmaq kimi şeylərin onda mənası yoxdur. Ona görə, insan bu şəninə diqqət etməklə, digər aləmlərin (həqiqətlərini dərk etməkdə, zaman çərçivəsindən xaric ola bilər.(٢



---

Məsnəvi, ۴, ٣٠٣١ . [١] -١

Bu barədə baxın: Səmavi hədiyyə "İnsan irfan ürfündə məqaləsinə şərh". Seyid . [٢] -٢ Yusif İbrahimiyan, səh ٢٩٩- ٣٠٨

Sual

Mistik təcrübə ilə vəhyin fərqi varmı? Vəhylə ruhi təcrübənin arasında olan fərq ?nədədir

Cavab

Sizin sual bundan ibarətdir ki, vəhy üçün psixologiya nəzərində təhlil ilə, vəhydən başa düşdüyümüz məna arasında olan fərq nədir? Bu mühüm suala cavab vermək üçün, yaxşı olar vəhydən ruh mənasına təfsir edənlərin nəzərində diqqət yetirək; Əlbəttə onların bundan məqsədi budur ki, vəhy peyğəmbərin öz daxilindən gələn bir ilhamdır ki, onun ruhuna əlavə olur və bu əlavə olmaqlıq onun öz şəxsi daxilində olan məlumatlardır ki, münasib yerlərdə bəyan edir və xaricdən ona bir şey vəhy olmur. Həqiqətən pak fitrət, iman, ilahi ruh və Allaha möhkəm inam və bütün pis əməllərdən və əqidələrdən uzaq olmaq və ailənin pak və təmiz olması, bütün bunlar onun ruhiyyəsində təsir qoyaraq, onu cəmiyyətə böyük bir şəxsiyyət olaraq təhvil verir; .onun təfəkkürü, dünyaya baxışı və ruhu təcrübələri xüsusi təəsuratlar yaradacaqdır

Bu təəsuratlar o qədər mənalıdır ki, yuxular və müxtəlif təcrübələr özündən aslı olmayaraq özünü qeyb aləmi və səmadan nazil olan Allahın hidayəti olan vəhy hesab edir. Amma bütün bunlar onun ruhu təcrübə və öz daxilindən

(gələn inamlardan başqa bir şey deyildir.(۱)

:Bu nəzəriyyə yuxarıda xülasə şəkildə açıqlanaraq bundan ibarət olur ki

۱. İnam məkan və zamana ehtiyacı olmayan o uca Allahdan xəbər gətirməyə qadir deyildir.

۲. İnsanın ruhu və varlığı zaman daxilində maarif və elm istedadına malik ola bilir, amma adi hallarda bundan bəhrələnə bilmir; və xüsusi səbəblər bu elm mərkəzinin qapılarını onun üzünə açılmasına yol açır və bunun nəticəsində gizli və qeyb elmlərinə sahib olur.

Amma bizim əqidəmizdə bu fikir, vəhyin həqiqətindən tamamiylə fərqli, və heç bir rabitəsi yoxdur, çünki:

Birncisi, baxmayaraq ki, insanda olan ruh təcrübəsi və istedad inkar edilməzdir və bəzi ilhamlar və həqiqətlər bir neçə şərait daxilində insanın ondan xəbəri olur; amma bu mətləb peyğəmbərlərin sonsuz elmini onların ruhu təcrübəsi olaraq isbat etmir və bunun özü dəlil istəyir. Bunlardan əlavə tarix sabit edir ki, (bəzi Quran ayələrindən əlavə) peyğəmbərlər öz maariflərini (vəhyi) özlərinin heç bir təsirləri olmadıqlarını bildirirlər.

İkinci: İnsanın şəxsiyyəti və ruh təcrübəsinin tərəfdarları, belə hesab edirlər ki, insanın daxili qüvvəsi, insanın zahiri hissi və qüvvəsinin tətil olduğu vaxt ayılır və fəaliyyət göstərir; amma vəhyi qəbul edən hislər isə hər zaman ayıq və dəqiqdir; tarixin verdiyi xəbərə görə, vəhyin nazil olduğu ən çox vaxt o vaxtlara məxsusdur ki, insanların cəmiyyətdə şəxsi işlərinə aid təbliğ etsin.

Üçüncü: O şəxslər ki, vəhyi, ruhi təcrübə bilirlər təsəvvür edirlər ki, mələklər və onlarkı Allahın kəlamını peyğəmbərlərə nazil etməkdə vasitədirlər hər nə qədər gözə görünməsə də



---

۱- [۱]. Nümunə üçün bax: Təfsiri Əlminar, Məhəmməd Raşid Rza, cild ۱۱, səh ۱۶۴- ۱۹۰.

insanın ruhundan yüksək olan ilahi ruh deyildir, hətta insanla Allah arasında olan vəhy adlandırıla. Bəs vəhy insanın öz daxilindən qaynaqlanana təcrübədən başqa bir şey deyildir.(۱) Amma bu da birinci bəhsdən fərqli olaraq dəlilə ehtiyacı verdır. Elə ki, biz öz ümumi və adi elmimizlə mələklərin keyfiyyət, say iş və qüdrətlərini öyrənə bilmərik və Allah tərəfindən vəhyin peyğəmbərlərə necə nazil olmasının keyfiyyətini bilməyə qadir .deyilik

Dördüncü: Əgər vəhy, insanın daxilindən və ruhi təcrübəsidirsə nə üçün indi peyğəmbərlər kimi bir şəxs tapılmır və öz daxili və ruhi təcrübələri vasitəsilə xəbər ?vermirlərki, peyğəmbərlərin vəhyi qarşısında nümunə olsun

Bu nümunənin olmaması bunu təyid etmir ki, vəhy tamamiylə başqa bir şeydir?(۲) Bu təhlillər nəticəsində vəhy və ruhu təcrübə arasında olan fərqləri bu cür sadalamaq .olar

Ruhu təcrübədə, vasitə və xəbər verən insan vücudundan xaric deyil, amma vəhydə .۱ .isə insan xaricdən olan bir qüdrətlə üzləşir

Vəhy olduğu zaman tamamıyla ayıq və hər bir şeydən xəbəri olur, amma ruhu .۲ təcrübədə isə bu qüvvə lazımdır ki, tətil olaraq hər bir şeydən xəbərsiz olsun ki, ruhu .təcrübə ayılaraq bəzi işlərdən xəbər versin

Vəhy hər tərəfli olaraq öz mövqeyini saxlayır və bu da onu göstərir ki, insanın .۳ daxilindən və ruhi təcrübəsindən daha estendür; çünki ruhi təcrübələr bir baxımdan .naqis və bir tərəflidir

Vəhy, nazil olduğu şəxs və dinləyicilərə inam və yəqin doğrudur, ruhu təcrübə isə bu .۴ .yəqin və inamı özündə doğrultmamışdır

O şəxslər ki, ruhu təcrübəyə (qeyd olan açıqlama əsasında) sahibdirlər, sayları daha .۵ çoxdur, amma verdikləri



---

Dairətul- məarif, əl- Quranil rabul əmr. Məhəmməd Fərid vəcdi, "vəhy" . [۱] -۱

xəbərlər isə bir- birinin ziddinədir; və vəhy sahibləri (peyğəmbərlər) isə sayları az, amma verdikləri xəbərlər də bir- birinin ziddinə deyil və bu özü bunu isbat edir ki, .vəhyin mənşəyini ruhi təcrübədən kənarda axtarmaq lazımdır

Ruhu təcrübənin dərk edilməsi dəlilsiz və oxşarsız deyil, vəhy isə dəlil üzərində .۶ oxşarsız və bərabəri yoxdur bundan əlavə başqalarının onun kimi gətirməsinə dəvət .edir

Bəs bu nöqtəyə diqqət etmək lazımdır ki, əgər təkrar olunmaz bir məsələylə üzləşiriksə, və bunu heç bir zaman icra edib nümayiş etdirməyə qüdrətimiz yoxdursa və ruhi təcrübə ilə buna yol tapa bilmiriksə, ixtiyarsız olaraq onu elmi təcrübə olaraq adlandırırıq; və yaxud onu ağıl dərk etməz bir varlığı kimi və təbiətdən kənar olan bir məsələ kimi qəbul etsək bunu ağıl və təfəkkür çərçivəsindən yuxarı olan bir varlıq kimi .adlandırmaq və heç bir xeyri olmadığını qəbul edək

## HERMENEVTİKA, ONUN ƏSASLARI VƏ PROBLEMLƏRİ.۶

Sual

?Hermenevtika nədir? Onun əsaları nədən ibarətdir? Onu necə tənqid etmək olar

Cavab

Hermenevtika termini Yunan kəlməsi olub, "Hermeneuin" sözündən götürülmüşdür. Feldir və təfsir etmək mənasındadır. Bəziləri onu "Hermes" (Hermes) Yunan Allahı və Allahlar tərəfindən xəbər gətirən və onu təfsir edən mənasında olduğunu bildirirlər. Bəs hermenevt təfsir edir və hermenevtin işi bundan ibarətdir ki, kəlmənin mənasını və xəbərləri təfsir etsin. Amma Hermenevtika termini mənasında çox təriflər olmuşdur. Bunun üçün kifayət qədər fürsət burada yoxdur; amma termini mənası bundan ibarətdir: hermenevtika "təfsirdə olan fəlsəfə və yaxud nəzəriyyə" bir növ .tədqiqat deməkdir ki, insanların ictimai yaşayış tərzinə məxsusdur

Bu tərif əsasında, hermenevtika bundan ibarətdir ki, insanda olan fikir necə meydana gəlir? Məna necə alim bir şəxsdən başqa bir ağıllı insana köçür, bu cür suallardır ki, bir çox bəhsləri, misal üçün həqiqəti tapmaq, tanımaq və düşüncənin əsli, fikirdə olanları nitq ilə anlatmaq təfəkkür və nitqin tarixi, həyatda olan təcrübə və ya təbiət şünaslıq. Keçmişi dərk etmək, üfüqlərin təsiri məna və fikir üçün müqəddimələr mətləbi başa

